
İNTİZAR
(Müvəffəqiyyətin
sirləri silsiləvi bəhsləri-1)
Seyyid Mürtəza Müctehidi

# Mündəricat

## İNTİZAR

### KİTAB HAQQINDA

(Kitabın adı:İntizar (Müvəffəqiyyətin sirləri” silsiləvi bəhsləri-١

Müəllif:Seyyid Mürtəza Müctehidi

Mütərcim: M. Əlizadə

:Naşir

:Çap tarixi

Səhifələrin sayı:١٩

Çap növbəsi:Birinci

Tirajı:٣٠٠٠

səh:١

## İNTİZAR

:Həzrət Əmirəl-mö’minin Əliyyibni Əbitalib (ə)-ın kəlamlarından

اَفْضَلُ عِبادَهِ الْمُؤْمِنِ اِنْتِظارُ فَرَجِ اللهِ

Mö’min bəndənin ən gözəl ibadəti odur ki, Allah tərəfindən olan qurtuluşun intizarında“ ”.olsun

## İNTİZARIN DƏYƏRİ

İntizar müvəffəqiyyət yolunda irəliləyən insanların ən yüksək xüsusiyyətlərindən biridir. Çünki vəhy xanədanının qeybət dövründə böyük ilahi şəxsiyyətlər ilə əlaqədar buyurduqları dəyərli kəlamlara əsasən, zühurun həqiqi intizarını çəkənlər bütün .zamanlarda insanların ən fəzilətlisi hesab olunurlar

Buna görə də bir qrup insanlar intizar məsələsindən əldə etdikləri kamil bir nəticə əsasında onu müvəffəqiyyətin bu dövrdəki ən mühüm amili hesab edir və inanırlar ki, insan bütün təkamül amillərini həqiqi intizarda axtarıb tapa, onun vasitəsilə mə’nəviyyət qüllələrinə doğru pərvaz edə və özünü ictimai çətinliklərdən və ruhi .giriftarçılıqlardan xilas edə bilər

İntizar özünün kamil və həqiqi mə’nasında çox çətin bir halətdir. Sanki sirlərlə dolu bir yığındır ki, onu əhatə etmişdir, çox az layiqli insanlar onun kamal həddinə nail və (düşmənlərin şayiələrindən amanda olmuş-lar.(١)

Çünki intizar onun son və ali mərhələsində – belə ki, İmam Zaman (ə.c)-ın xüsusi səhabələri üçün belə bir mərhələ mövcuddur – qeyri adi qüdrətlərdən istifadə etməklə asimani quruluşun bərqərar edilməsi və o həzrətin mələkuti hökumətində xidmətçilik .üçün kömək və hazırlıq mə’nasınadır

İntizar kerçəkləşdiyi hər bir mərhələdə bir növ qeyb aləmindən batini bir imdad diləmək, Allah dərgahına yaxınlaşmaq yoludur, əgər bu davam edib təkamülə çatarsa, zamanın keçməsi ilə insan hüququnun dərinliklərində

İmam Zaman (ə.c) -in yad və xatirəsinə təvəssül etməklə intizar mərasimini [١] -١ bərqərar edənlər çoxdur. Allaha həmd olsun ki, bu cür məclislərin bərqərar edilməsi günbəgün yayılmaqdadır. Bizim məqsədimiz bu məclisləri və bu cür şəxsləri inkar etmək, onlarda intizar halətini inkar etmək deyildir. Çünki intizarın müxtəlif mərhələləri vardır, intizarın kamal həddinə, onların ali mərtəbəsinə çatan şəxslər, az olsa da belə, məhz həmin cür şəxslərin arasından çıxmışlar. Onlar çox çətinliklərə, xoşagəlməz hadisələrə dözməklə, yorulmaz fəaliyyətlərlə seçdikləri bu yolda heç vaxt geri çəkilməmişlər.Şe'r: Ze xofi badiye del bəd nəkon bebənd ehram Ki mərd ra nə əndişəd əz nəşibo fəraz Tərcüməsi: Biyabanın, səhranın qorxusundan qorxma, ehram bağla, .Çünki yolçu, yolun enişi-yoxuşu barəsində fikirləşməz

mövcud olan qaranlıqlar, onun agah olmadığı batinindəki zülmətlər məhv olacaq və insanın batinində nurani bacalar yaranacaq və bu yolla da təkamül yolunu onun üzünə açacaqdır. Çünki intizar bütün yönlərdə hazırlıq halətindən ibarətdir, batini səfa-səmimiyyət və nuraniyyətlə dolu olan bir dünyaya doğru yönəldir. Bütün şər və şeytani qüdrətlərin və qüvvələrin məhv olduğu, ilahi nurların bütün insanların ruhlarına saçdığı ...bu dünyada

Bu həqiqətə diqqət yetirməklə belə deyirik: İntizar yolunun ən ali mərhələsinə qədəm qoyan bir şəxs xariqulədə qüdrətlərə malik olmalıdır. Çünki bildiyiniz kimi İmam Əsr -in hökuməti mələkuti və son dərəcə misilsiz olan bir hökumətdir ki, onun kamil şəkildə dərk edilməsi bizim təfəkkür qüdrətimizdən çox-çox yuxarıdır. Köməkçiləri pərvanə kimi o həzrətin vücudunun şamı ətrafına yığışmalı, o həzrətə kömək etməlidirlər ki, həm özləri bu yolda irəliləyənlərdən olsunlar, həm də o həzrətin mələkuti fərmanlarına (itaət etmək qüdrətinə malik olsunlar ki, bu da xariqulədə qüdrətlər tələb edir.(١

İmam Zaman (ə.c)-in ٣١٣ nəfər seçilmiş köməkçilərinin xüsusiyyət və vəsflərini bəyan edən rəvayətlər onları ruhi və qeyri-adi, hətta qeybət dövründə belə bir qüdrətə malik .olanlar kimi təqdim edir

## İNTİZARIN AMİLLƏRİ

Biz çalışmalıyıq ki, intizarın həqiqi mə’nasından agah olaq və bu həqiqəti həm .özümüzdə, həm də başqalarında icad edək

İntizar məsələsinin ümumi bir məsələ olması, onun əzəmətini öyrənmək və başqalarına öyrətmək üçün müxtəlif yollar vardır ki, onlardan istifadə etməklə intizar halətini cəmiyyətdə icad edə və onların vücudlarının ənginliklərində intizar toxumlarını cüərdə bilərik. İndi isə ən mühüm yolları bəyan edirik ki, onların vasitəsilə cəmiyyət :intizar məsələsinə doğru meyl edir

;İmam Zaman (ə.c)-in əzəmətini tanımaq, əzəmətli vilayət məqamı ilə tanış olmaq-١

;İntizarın qəribə əsərlərini, onun kamil mə’nasını və ali mərhələlərini bilmək-٢

İmam Zaman (ə)-ın səhabələrinin vəsf və xüsusiyyətlərini öyrənmək, belə ki, onlar-٣

intizarın ən ali mərhələsinə çatmış, çox yüksək və əzəmətli ruhi qüdrətdən bəhrələnmişlər və İmam Zaman (ə)-ın fərmanlarına sözsüz itaət edirlər.

səh:۳

---

۱- [۲] Çoxlu rəvayətlərdə İmam Zaman -in hökumətində xariqul-adə qüdrətlərdən istifadə edilməsi aşkar şəkildə bəyan olunmuşdur.

İnsan və dünyanın gələcəyi ilə, zühur dövründəki insanların həyatında baş verən-۴ (mühüm və əzəmətli dəyişikliklərlə tanış olmaq.(۱)

İmam Zaman (ə.c)-ın məqamı barədə mə’rifət kəsb etmək, o həzrətin köməkçilərini tanımaq, əqlin təkmil olunması və elmin təkamülü, qeyb aləmi ilə rabitə bərqərar edilməsi, namə’lum varlıqları tanımaq, asimanlara və uzaq fəzalara səfər etmək və bu qədimdən olan digər məsələlər insanları İmam Zaman (ə)-ın zühur məsələsinə doğru səsləyir, o həzrətin sirli və əzəmətli dövləti üçün hazırlıq və intizar halətini onlarda icad .edir

Bu cür həqiqətlər barədə elm və agahlıq əldə etmək pak xislətli insanların hamısının qəlbində və ruhunda eşq və həyəcan yaradır, onları bu alicənab şəxsin dövründəki gözəl yaşayışa aşiq edir, hər bir insanın danılmaz vəzifəsindən ibarət olan intizar və zühurun gözlənilməsi halətini cəmiyyətdə icad edir. İndi isə qeyd olunan mətləblərə :işarə qeyd edirik

### İMAM ZAMAN (ə.c)–İN MƏQAMI İLƏ TANIŞLIQ –۱

İmam Zaman (ə)-ın xüsusiyyətləri və vəsfləri ilə tanış olmaq, o həzrətin əzəmətli vücuduna diqqət yetirmək intizar halətinin icad edilməsində olan ən mühüm .amillərdən biridir

Hal-hazırda bütün dünyanın başdan-başında və bütünlükdə yaradılış dünyasında o həzrətdən başqa heç bir şəxsin varlıq aləminin islah olunmasına və onun rəhbərliyinə ləyaqəti olmadığına diqqət yetirmək insanı ona doğru cəzb edir. O həzrət ilahi “azuqə”lərin sonuncusu, dünya əmrlərinin yeganə varisidir ki, həzrət Əmirəl-mö’minin :Əli (ə) onların barəsində belə buyurmuşdur

عِلْمُ الْاَنْبِیاءِ فِی عِلْمِهِمْ وَ سِرُّ الْاَوْصِیاءِ فِی سِرِّهِمْ وَ عِزُّ الْاَوْلِیاءِ فِی عِزِّهِمْ، کَالْقَطْرَهِ فِی الْبَحْرِ وَالذَّرَّهِ فِی الْقَفْرِ

Peyğəmbərlərin elmi onların elminin, vəsilərin sirri onların sirrinin və vəlilərin“ (övliyaların) izzəti onların izzəti müqabilində dəryada bir qətrə və biyabanların (arasında bir zərrəyə oxşayır.”(۲)

İndi ki, biz bu xanədandan olan belə bir insanın zamanında yaşayırıq, vəzifəmiz budur

ki, o həzrətə diqqət yetirməklə, onun hidayətçi istəklərinə tabe olmaqla özümüzü puçluqdan, qəflətdən xilas edək, o həzrətin dünya

səh:۴

---

Bunun üçün digər yollar da mövcuddur ki, insanı intizara doğru səsləyir. Biz [۳] -۱ onların bə’ziləri barəsində bu kitabda müəyyən izahlar vermişik. O cümlədən ixlas məsələsi, maariflə tanış olmaq, Əhli-beytə ¢-a məhəbbət bəsləmək, ruhu və qəlbi .mə’nəvi aludəliklərdən saflaşdırmaq və sair

.Biharul-ənvar”, cild ۲۵, səh.۱۷۳“ [۴] -۲

səviyyəsindəki hökumətinin intizarında olaq, çünki o hidayət və ədalət bayrağını bütün .dünyada sancacaqdır

Əgər bir şəxs bu dünyada o həzrəti tanısa, İmam Zaman (ə.c)-in qeybi yardımlarından agahlıq əldə etsə, o həzrətin zühur dövründə bütün dünyada yaratdığı dərin dəyişikliklərlə tanış olsa, həmişə onu xatırlayacaq və vilayət günəşinin saçmasının (intizarında yaşayacaqdır.(١

Mə’rifət belə bir insanda qəflət paslarını onun qəlbindən təmizləyir, əvəzində səfa və nuraniyyət yaradar. İndi isə o həzrətin qeybəti dövründə onun qeybi yardımlarını .göstərən bir rəvayətə diqqət yetirin

Cabir Co’fi, Cabir ibni Əbdüllah Ənsaridən nəql edir ki, Peyğəmbəri Əkrəm i belə :buyurmuşdur

... ذاکَ الَّذِی یَفْتَحُ الله – تَعالَی ذِکْرُهُ – عَلَی یَدَیْهِ مَشارِقَ الْاَرْضِ وَ مَغارِبَها، ذاکَ الَّذِی یَغِیبُ عَنْ شِیعَتِهِ وَ اَوْلِیائِهِ غَیْبَةً لَا یَثْبُهُ فِیهَا عَلَی الْقَوْلِ بِاِمامَتِهِ إلَّا مَنْ اِمْتَحَنَ الله قَبْلَهُ بِالْإِیمانِ.

قَالَ: فَقَالَ جَابِرُ: یَا رَسُولَ اللهِ فَهَلْ یَنْتَفِعُ الشِّیعَهُ بِهِ فِی غَیْبَتِهِ؟ فَقَالَ صلی الله علیه و آله و سلم: اِی وَالَّذِی بَعَثَنِی بِالنُّبُوَّهِ اَنَّهُمْ لَیَنْتَفِعُونَ بِهِ وَ یَسْتَضِیئُونَ بِنُورِ وِلَایَتِهِ فِی غَیْبَتِهِ کَانْتِفَاعِ النَّاسِ بِالشَّمْسِ، وَ إِنْ جَلَّلَهَا السَّحَابُ، یَا جَابِرُ، هذَا مَکْنُونُ سِرِّ الله وَ مَخْزُونُ عِلْمِهِ فَاکْتُمْهُ إلَّا عَنْ اَهْلِه.

Odur həzrəti Məhdi ki, Allah taala onun əlləri ilə yer üzünün şərqini-qərbini fəth“ edəcəkdir. O həmin kəsdir ki, öz şiələrindən və dostlarından qaib deyildir. Belə ki, Allahın yalnız qəlbini imanla imtahan etdiyi şəxslərdən başqa heç bir şəxs ona əqidədə ”.sabitqədəm qalmaz

Cabir Co’fi dedi: Cabir ibni Əbdullah Ənsari Peyğəmbəri Əkrəm i-dən soruşdu: “Ya ”?Rəsuləllah! Qeybət dövründə şiələr ondan bəhrələnəcəklərmi

Peyğəmbər i onun cavabında buyurdu: “Bəli, məni risalətə məb’us edən Allaha and olsun ki, onlar onun vasitəsilə qeybət dövründə bəhrələnəcəklər, onun vilayət nurunun vasitəsilə nuraniləşəcəklər. Necə ki, camaat buludlu havada olsa belə, günəşdən istifadə edirlər. Ey Cabir, bu, Allahın gizli sirri və Onun xəzinə olunmuş (elmidir, bunu əhlindən başqasından (ləyaqəti olanlardan başqasından) gizli saxla.”(٢

Gördüyünüz kimi, Peyğəmbəri Əkrəm i bu rəvayətdə tə'kidlə and içərək buyurur ki, şiələr İmam Zaman (ə)-ın qeybət dövründə o həzrətin vilayət məqamından nur .alacaqlar

:Şe'r

,Kist bi pərdə be xurşid, nəzər baz konəd

.Çeşme puşideye ma, illəte peydayiye tost

səh:۵

---

.Biharul-ənvar", cild ۵۲, səh.۱۴۵" [۵] -۱

.Kəmalud-din", səh.۱۴۶-۱۴۷; "Biharul-ənvar", cild ۳۶, səh.۲۵۰" [۶] -۲

,Əz lətafət nətəvan yaft koca mibaşi

.Caye rəhm əst bər an kəs ke təmaşaye tost

Qeybət dövründə İmam Zaman ¶ gözə görünmür, lakin həqiqətdə qeybət pərdəsi bizim öz qəlblərimizdə mövcuddur. İmam (ə) parlaq bir nur kimidir – qəlbində bəsirət .olan bir şəxs üçün aşkardır. Hətta zahirdə gözlər onu görməsə də belə

Bu həqiqətə diqqət yetirmək, insanı o həzrətin vilayət məqamındakı elm və qüdrəti ilə tanış edir, İmam Zaman (ə)-ın məhəbbətini qəlblərə salır və o həzrətin dünya səviyyəli .hökumətini gəlib çatması intizarını qəlblərdə yaradır

## İNTİZARIN NƏTİCƏLƏRİ İLƏ TANIŞLIQ –٢

### Mə’yusluqdan və ümidsizlikdən yaxa qurtarmaq –١

Dinin heç bir rol oynamadığı, insanların daha yaxşı gələcəyə ümidləri olmadığı bir cəmiyyətdə həyatdan mə’yusluq, qətl, qan axıdılması, izhar əməliyyatı olduqca çox gözə çarpır. Çünki camaat mənfi amilləri, o cümlədən fəqirlik, yoxsulluq, zülm, sitəm, təcavüzkarlıq, qanunsuzluq, insan hüquqlarına e’tinasızlıq və bu kimi məsələləri görür və onun müqabilində bu puçluqlardan heç bir çıxış yolu görmürlər. Məhz buna görə də insanın həyatını korlayan ümidsizlik və mə’yusluğa düçar olurlar. Çünki onların Allah və gələcəyə ümidi yoxdur, bu qədər çətinliklərdən və müşküllərdən qaçıb xilas olmaq üçün intihar əməliyyatını çıxış yolu təsəvvür edirlər. Onlar belə bir cinayətə əl atmaqla nəinki dünya və axirətlərini, hətta öz övladlarının, həyat yoldaşlarının, yaxın qohum-.əqrəbalarının da gələcəyini puçluğa doğru çəkirlər

Lakin öz vücudunda intizar haləti yaradan, hər an vilayətin parlaq nurunun bütün dünyanın hər bir yerinə saçmasına ümid bəsləyən bir şəxs heç vaxt belə cinayətlərə əl atmağa razı deyildir. Buna əsasən, fərəcin intizarında olmaq onun üçün bir qurtuluş və ümidsizliklərdən xilas olma yoludur. Aşağıda qeyd olunan rəvayət həmin mətləbi :bəyan edir

عَنِ الْحَسَنِ بْنِ الْجَهْمِ قَالَ: سَأَلْتُ اَبَا الْحَسَنِ عليه السلام عَنْ شَيْءٍ مِنْ الْفَرَجِ؟ قُلْتُ: لَا اَدْرِى إِلَّا اَنْ تُعَلِّمَنِى. فَقَالَ عليه السلام: نَعَمْ، اِنْتِظَارُ الْفَرَجِ مِنَ الْفَرَجِ.

Həsən ibni Cəhm deyir: “Həzrəti Musa ibni Cə’fər £-dan fərəc barəsində sual etdikdə həzrət buyurdu: “Məgər bilmirsən ki, fərəcin intizarında olmaq, fərəcin özündən bir miqdardır?” Dedi: “Mənim xəbərim

yoxdur, yalnız siz mənə bu barədə xəbər verə bilərsiniz.” İmam (ə) buyurdu: “Bəli, (fərəcin intizarında olmaq fərəcin bir hissəsidir.” (١)

**Ruhi təkamül –٢**

İnsan kamil intizar haləti icad etməklə zühur dövrünün insanlarının halətindən bir miqdarını – qəlbini paklamaq kimi – özündə icad edə, ümid və intizar vasitəsilə özünü .ümidsizlikdən və puçluqdan qurtara bilər

Buna görə də İmam Sadiq (ə) öz əziz atasından, onlar da Əli (ə)-dan nəql edirlər ki, o :həzrət belə buyurmuşdur

اَفْضَلُ عِبَادَهِ الْمُؤْمِنِ اِنْتِظَارُ فَرَجِ اللهِ.

Mö’min şəxsin ən yaxşı ibadəti budur ki, Allah taaladan olan fərəcin intizarında“ (olsun.”(٢

Buna əsasən insan intizar halətinə malik olmaq nəticəsində zühur dövründəki təkamül əsərlərindən bə’zilərini özündə icad edə bilər. Mətləbin izahı üçün İmam Səccad (ə)-ın :Əbi Xalidə buyurduğu bu sözə diqqət yetirin

عَنْ اَبِی خَالِدِ الْکَابُلِی عَنْ عَلِیِّ بْنِ الْحُسَیْنِ علیه السلام: تَمْتَدُّ الْغَیْبَهُ بِوَلِیِّ اللهِ الثَّانِی عَشَرَ مِنْ اَوْصِیَاءِ رَسُولِ اللهِ صلی الله علیه و آله و سلم وَ الْاَئِمَّهِ بَعْدِهِ، یَا اَبَا خَالِدٍ، إِنَّ اَهْلَ زَمَانِ غَیْبَتِهِ، اَلْقَائِلُونَ بِاِمَامَتِهِ، اَلْمُنْتَظِرُونَ لِظُهُورِهِ اَفْضَلُ اَهْلِ کُلِّ زَمَانٍ، لِاَنَّ الله – تَعَالَی ذِکْرُهُ – اَعْطَاهُمْ مِنَ الْعُقُولِ وَ الْاَفْهَامِ وَ الْمَعْرِفَهِ مَا صَارَتْ بِهِ الْغَیْبَهُ عِنْدَهُمْ بِمَنْزِلَهِ الْمُشَاهَدَهِ، وَ جَعَلَهُمْ فِی ذلِکَ الزَّمَانِ بِمَنْزِلَهِ الْمُجَاهِدِینَ بَیْنَ یَدَیْ رَسُولِ اللهِ صلی الله علیه و آله و سلم بِالسَّیْفِ، اُولئِکَ الْمُخْلِصُونَ حَقًّا، وَ شِیعَتُنَا صِدْقًا، وَ الدُّعَاهُ اِلَی دِینِ اللهِ سِرّاً وَ جَهْراً، وَ قَالَ علیه السلام: اِنْتِظَارُ الْفَرَجِ مِنْ اَعْظَمِ الْفَرَجِ.

Əbu Xalid Kabuli İmam Əli ibni Hüseyn £-dan nəql edir ki, o həzrət belə buyurmuşdur: “Qeybət dövrü Peyğəmbəri Əkrəm i-in vəsilərinin və ondan sonrakı imamların on ikincisinin vasitəsilə çox uzun olacaqdır. Ey Əba Xalid, həqiqətən onun qeybət dövründə olan, imamətinə e’tiqad bəsləyən və zühurunun intizarında olanlar hər bir dövrdəki insanlardan üstündürlər. Çünki Allah taala onlara o qədər əql, dərk və mə’rifət əta edəcəkdir ki, qeybət onların nəzərində müşahidə kimi olacaqdır və onları o dövrdə Peyğəmbər i-in dövründə qılıncla cihad aparan mücahidlər kimi qərar verəcəkdir. Onlar həqiqətən ixlaslıdırlar və bizim sədaqətli şiələrimizdirlər, insanları

".aşkarda və gizlində Allah yoluna doğru də'vət edərlər

(Sonra İmam Səccad (ə) buyurdu: "Fərəcin intizarında olmaq ən əzəmətli fərəcdir."(۳

səh:۷

---

.Biharul-ənvar", cild ۵۲, səh.۱۳۰" [۷] -۱

.Biharul-ənvar", cild ۵۲, səh.۱۳۱" [۸] -۲

.Biharul-ənvar", cild ۵۲, səh.۱۲۲" [۹] -۳

Şe’r:

Dust nəzdiktər əz mən be mən əst,

Vin əcəbtər ke mən əz vey durəm.

İn suxən ba ke təvan qoft ke dust

Dər kənare məno mən məhcurəm.

İntizar yolunda təkamülə çatan həqiqi intizarçılar özlərini Allahın qeybi qüdrətlərinin bütün dünyanın hər yerinə hakim kəsilməsi üçün hazırlamaq nəticəsində qeybət dövründə zühur dövrünün şəxslərinə məxsus olan xüsusiyyətlərdən bir qismini – qəlbin paklanması kimi – nail olacaqlar. Belə ki, qeybətin qaranlıqlı ruzigarı onlar üçün müşahidə olunan bir gün kimidir. Əgər intizar onlarda bu kimi tə`sirlər qoymazsa, onda fərəcin intizarı necə ən əzəmətli fərəc ola bilər? Onlar intizar halətində belə zühur dövrü ilə qeybət dövrü arasında əlaqə yaradır, o ruzgarın halətlərindən bə’zilərini qeybət dövründə əldə edirlər.(١)

## MƏRHUM ŞEYX ƏNSARİ İMAM ZAMAN (ə.c)–İN MƏNZİLİNDƏ

İndi isə qəlblərin aydın olması üçün şiə aləminin böyük şəxsiyyətlərindən bə`zilərinin başına gələn müəyyən hadisələri burada xatırladırıq ki, qeybi qüdrətlərə malik olmaq nəticəsində aşkarda və gizlində Allah dininə kömək etmək üçün tədbir görmüşlər.

Mərhum Şeyx Ənsarinin şagirdlərindən biri o alicənab şəxsin İmam Zaman (ə)-la olan əlaqəsini və o həzrəti onun mənzilində ziyarət etməsi barədə belə deyir:

Həzrət Əbu Əbdillah (ə)-a məxsus olan ziyarətlərin birində Kərbəlaya getmişdim. Gecə yarısından sonra hamama getmək üçün evdən çıxdım. Küçələr torpaq olduğuna görə özümlə bir çıraq götürmüşdüm. Uzaqdan şeyxə oxşar bir şəxs gördüm. Bir qədər yaxınlaşdıqda gördüm ki, şeyxin özüdür. Öz-özümə fikirləşdim ki, o gecənin bu vaxtında, özü də gözləri zəif olduğu halda bu torpaq yolla haraya gedir? Mən bir kəsin ona həmlə etməməsi üçün onun ardınca yola düşdüm. Nəhayət bir xaraba evin qapısında dayandı, “Camiə” ziyarətini xüsusi diqqətlə oxudu, sonra o evin içinə girdi!

Mən artıq heç bir şey görmürdüm, lakin şeyxin səsini eşidirdim. Sanki bir şəxslə söhbət edirdi. Mən hamama getdim və bundan sonra mütəhhər hərəmə müşərrəf oldum, şeyxi həmin yerdə gördüm. Səfər sona çatdıqdan sonra Nəcəfi-Əşrəfdə onun hüzuruna gəlib o gecə gördüyüm hadisəni ona dedim. Şeyx əvvəlcə bunu inkar etdi, :amma çoxlu israrddan sonra buyurdu



---

Qeyd etdiyimiz kimi, mərhum Seyyid Bəhrul-ülum və mərhum Şeyx Mürtəza [۱۰] -۱ .Ənsari kimi çox nadir şəxslər bu halətlərə malik olmuşlar

Bə’zi vaxtlarda İmam Zaman (ə)-ın hüzuruna çatmaq üçün icazə alıram, o həzrətin“ evinin arxasına gedirəm ki, sən onu heç vaxt görməyəcəksən, sonra camiə ziyarətini oxuyuram. İkinci dəfə icazə verdiyi zaman o həzrətin hüzuruna gedirəm və lazım olan mətləbləri Ondan soruşuram.” Sonra şeyx buyurdu: “Mən sağ olduğum müddət (ərzində bu mətləbi gizli saxla və heç bir kəsə demə.”(١)

:Şe’r

,Kelide gənce səadət fotad be dəste kəsi

.Ke nəxle həstiye u ra buvəd bəre hunəri

,Çu mustə’ed nəzər nisti, vusal məcuy

.Ke came cəm nədəhəd sud, vəqte bi bəsəri

## MÜVƏFFƏQİYYƏTLƏRİN RƏMZİ, MƏHRUMİYYƏTLƏRİN SİRRİ

Burada belə bir sual oluna bilər: Necə olub ki, mərhum Şeyx Ənsari hər vaxt icazə tapırdısa, İmam Zaman (ə)-ın mənzilinə gedirdi və “Camiə” ziyarətini oxumaqla – ikinci !?izn verilməklə – o həzrətin evinə daxil olurdu və onunla danışırdı

O bu məqama necə çata bilmişdi? Nəyə görə onun şagirdləri belə bir iftixara nail ola bilməmişdilər və Şeyx Ənsari buyurmuşdu ki, “Sən heç vaxt o evi tapa !?”bilməyəcəksən

Bu mühüm bir sualdır ki, qaneedici bir cavab istəyir və çox təəssüflər olsun ki, bə’zi adamlar belə sualların cavabında deyirlər ki, Allah belə istəmişdir, Allah (nəuzu billah) bə’zi şəxslərlə qohumluq əlaqəsi bərqərar etmişdir və insanların əməl və istəkləri ilə !heç bir əlaqəsi yoxdur

Əksər hallarda sual verənləri başdan eləmək üçün verilən bu cavablar düzgün deyildir. .Buna görə nə qaneedicidir və nə də bir şəxsi düzgün yola hidayət edə bilər

Biz vəhy xanədanının buyruqlarına diqqət yetirməklə bu sualın cavabında deyirik: Mehriban Allah bütün insanları mə’nəvi və ruhi təkamülə doğru çağırmış, bu yolda

qədəm götürən bütün insanlara mükafat verir. Necə ki, ev sahibi öz qonaqlarını də’vət və məclisdə iştirak edəcəkləri təqdirdə onların hamısını qonaq kimi qəbul edir. Allah taala da inkişaf və təkamül zəminələrini bütün insanlarda icad və beləliklə də onları :təkamülə doğru də’vət etmişdir. Qur’ani-Kərim aşkar şəkildə belə buyurur

وَ الَّذِينَ جَاهَدُوا فِينَا لَنَهْدِيَنَّهُمْ سُبُلَنَا

Hər kəs bizim yolumuzda sə’y edib çalışsa, Biz hökmən onu öz yolumuza doğru“ (hidayət edərik.”(٢

səh:٩

---

.Şeyx Ənsarinin həyatı və şəxsiyyəti”, səh.١٠۶“ [١١]-١

.Ənkəbut” surəsi, ayə ۶٩“ [١٢]-٢

Bu yalnız qonaqların vəzifəsidir ki, Allahın də’vətinə müsbət cavab versinlər, ruhi təkamül, mə’nəvi inkişaf yolunda qədəm götürsünlər. Buna əsasən, insanlarda inkişaf və mə’nəvi təkamülün zəminəsi vardır və onlar bu ne’mətlərdən bəhrələnirlər. Lakin onu ehtiyat saxlayaraq istifadə etmirlər. Bu da eynilə dar görüşlü sərvətlilərə bənzəyir ki, bankdakı hesablarında olduqca çoxlu sərvətlər yığılıb toplanır və bununla xoşhal .olurlar, lakin heç vaxt o sərvətlərdən istifadə etmək tofiqinə nail olmurlar

Müvəffəqiyyət üçün lazım olan mövcud imkanlardan və zəminələrdən istifadə etməli, çatışmayan cəhətlərinizi aradan qaldırmalısınız ki, özünüzün böyük hədəflərinizə çata .biləsiniz

İnsanların çoxu zati baxımdan mə’nəvi və ruhi təkamülə çatmaq üçün daha artıq hazırlığa və bacarığa malikdirlər. Lakin belə işlərə baş qoşmadıqlarından bu kimi bacarıqlardan istifadə etmirlər və elə bu halda da dünyadan köçüb gedir, onları torpağa tapşırırlar. Eləcə də keçmiş dövrlərdə olan sərvətli insanları qeyd etmək olar ki, öz mal-dövlətlərini və sərvətlərini qorumaq üçün onları yerə basdırıb gizlədirdilər. Nə özləri, nə də onların övladları bu kimi mal-dövlətdən azacıq belə olsun, istifadə .etmirdilər

Bə’zi insanların daha artıq ruhi bacarığa, daha yaxşı dərk qüdrətinə malik olmaları və bu xüsusiyyətləri hansı yolla əldə etmələrinin aydın olması üçün mərhum Şeyx Hürr Amulinin sözlərini qeyd edirik: (O, şiənin böyük şəxsiyyətlərindən və alimlərindən biri idi.) “Aydındır ki, görmək, eşitmək və sair kimi qüvvələr müstəqil şəkildə qulaq, göz və sair kimi üzvlərlə əncam tapılmır, əslində onlar ruh üçün bir vasitədirlər ki, ruh onların vasitəsilə görür, eşidir və sair. İnsanın ruhu güclü olmadığına görə görmək, eşitmək kimi qüvvələri bu kimi maddi səbəblərlə məhdudlanır və xüsusi çərçivədə olur. Buna görə də yalnız maddiyyatı görür, ruhi və mə’nəvi məsələləri görüb dərk etməkdən isə bacarıqsız olur. Amma əgər insanın ruhu ibadətlərin, vacibatların yerinə yetirilib, haram işlərin tərk edilməsi nəticəsində Allah dərgahına yaxınlaşaraq, ruhu qüvvətlənsə, onun maddiyyatdan və təbii şeylərdən istifadə etmə qüdrəti daha da artacaqdır. Buna əsasən, gözləri ilə başqalarının görmədiyi şeyi görəcək, qulaqları ilə .başqalarının eşitmədiyi şeyləri eşidəcək və sair

Bu qələbə və qüdrət müxtəlif şəxslərdə və müxtəlif səviyyədədir. Necə ki, onların Allah dərgahına yaxınlaşmaları da eyni səviyyədə deyildir. Hər kəs ibadət, nəfsin mə’nəvi aludəliklərdən təmizlənməsi vasitəsilə Allah dərgahına daha çox yaxınlaşsa, onun mə’nəvi və ruhi vəziyyətləri də daha

güclü olacaq, başqalarının göz, qulaq və sair kimi şeylərlə dərk edə bilmədiyi şeyləri (dərk edəcək və onlardan daha güclü olacaqdır.(١

Bu bəyanla aydın olur ki, nə üçün Şeyx Ənsari kimi şəxslər belə bir böyük ne'mətə nail ola bilirlər, lakin başqaları bu qüdrət və bacarıqdan məhrumdurlar. Onların gözləri bu .kimi işlər görməkdən acizdir

İntizar halətinə malik olmaq – onun kamil mə'nasında – bu kimi işlərin dərk olunmasını .sizin üçün töhfə və ərməğan gətirər

:Şe'r

,Dideye baten çu bina mi şəvəd

.Ançe penhan əst, peyda mi şəvəd

İntizar yolunda ürəkləri yanan, ruhlarını saflaşdıran şəxslər öz həvayi-nəfslərindən qaçaraq mə'nəvi tərəqqi yoluna qədəm qoyur və nəfsin hakimiyyət dairəsindən xaric .olurlar, daha nəfs, onları öz tərəfinə sürükləmək qüdrətinə malik olmur

Necə ki, kosmik gəmilər yerin orbitində qərar verildiyi və cazibə dairəsindən xaric olduğu zaman yerin cazibə qüvvəsi artıq onları öz tərəfinə cəzb edə bilmir. Siz də əgər zamanın keçməsi ilə özünüzü nəfsani istəklərin dairəsindən xaric etsəniz, nəfsin .cazibəsi və şeytani vəsvəsələr heç bir tə'sir qoymayacaqdır

Əhli-beyt ¢-ınköməkçiləri, o cümlədən cənab Salman kimi şəxslər məhz belə olmuşlar. Onlar nəfsin tə'sir dairəsindən çıxmış, maddiyyat çərçivəsindən xilas olmuşdular. Buna görə də qeyb aləmi ilə əlaqə bərqərar etmişdilər. Salmanın malik olduğu qüdrət və vilayət məhz buna görə idi ki, nəfsani istəklərin qüdrət dairəsindən xaric olmuş və öz həvayi-nəfsini məhv etmişdi. Əmirəl-mö'minin Əli (ə)-ın meyl və iradəsini öz meyl və iradəsinə hakim etmişdi və buna görə də gizli qüdrətlərdən və .qeybi qüvvələrdən istifadə edirdi

### VILAYƏT MƏQAMINI TANIMAQ –٣

Zühurun intizarında olmaq İmam Zaman (ə.c)-ın vilayət qüdrətini intizarda olan şəxsin

qəlbində və canında möhkəmlədir, onu bu əqidədə sabitqədəm və möhkəm saxlayır ki, bir gün Allah tərəfindən olan ilahi qüdrət o həzrətin əli ilə aşkar olsun və bütün dünya tağutçularını – zəif xalq kütlələrinin qanını zəli kimi soran insanları – öz yaramaz əməllərinin cəzasına çatdırsın və əzəmətli vilayət qüdrətini bütün dünyada aşkar etsin. O kəs imamət və vilayət məqamına malikdir ki, Allahın qüdrətini zahir və aşkar edə .bilsin



---

.Fəvaidut-Tusiyyə", mərhum Şeyx Hürr Amuli, səh.٨٢" [١٣] -١

Bu, intizarda olan bir şəxsin e'tiqad və düşüncəsidir. Buna əsasən, zühurun intizarında olmaq daim dinin əsl maarif və əqidələrinə e'tiqadlı olmaqla yanaşıdır. Çünki intizar, e'tiqad mə'rifətinin toxumlarını müntəzirçilərin zehnlərində cücərdir və bu mətləbləri onlara başa salır. Nəhayət dünyanın hər bir yeri vilayət və qüdrətin hakimiyyəti dairəsində sahmana düşər, vilayətin böyük qüdrəti dünyanın bütün zalım qüdrətlərini dizə çökdürər, dünyanın maddi mədəniyyəti ilahi vilayətin sonsuz qüvvələri müqabilində tab gətirə bilməz və aləm dünya islahatçısının qəribə və heyrətləndirici .qüvvələri müqabilində olaraq onun ixtiyarına keçər

**İDDIAÇILARI TANIMAQ –۴**

Tarix boyunca çoxlu insanlar məhdiçilik iddiası ilə qiyam etmiş və özlərini insanların islahatçısı və rəhbəri kimi tanıtdırmışlar. Bu hiylə ilə çoxlu insanların qanını, canını və malını hədərə vermiş və bir qrup insanları azğınlığa doğru çəkmişlər. Amma intizar yolunda sədaqətlə qədəm götürən, öz vücudunu vilayətin parlaq nuru ilə işıqlandıran :bir şəxs bu şeytansifət ovçuların hiylələrinə uymayıb, onların toruna düşmür

Mə'rifət yolunun azdırıcılarını tanımaları və onların barəsində mə'rifət kəsb etmələri belə insanların yüksək imamət məqamı ilə tanış olmaları sayəsindədir. Buna görə də onlar abi-həyat (dirilik suyunun) yolunu ilğım qarşısında satmaz və xilafət .qəsbkarlarını imamətlə dəyişməzlər

**TƏKAMÜLƏ ÇATMIŞ MÜNTƏZİRLƏRLƏ, YAXUD İMAM ZAMAN (ə.c)–IN BÖYÜK–۳ SƏHABƏLƏRİ İLƏ TANIŞLIQ**

İnsanların intizar yoluna cəzb olunmasına səbəb olan digər amillərdən biri də onların təkamülə çatmış müntəzirlərin və İmam Əsr (ə)-ın səhabələrinin məqamı ilə tanış .olmalarıdır

İntizarın müntəzərlər üçün ərməğan gətirdiyi tə'sirlərdən biri də budur ki, nəinki onlar yalnız əqidə və e'tiqad baxımından Əhli-beytin ¢ əzəmətli vilayət məqamına arifdirlər, üstəlik özləri də vilayət günəşinin saçdığı nurlardan bir baca hesab olunurlar. Yə'ni, intizar yolunda olan təkamül nəticəsində (özlərinin mə`nəvi tutumları həddində) vəhy xanədanının məqamından mə'nəvi və ruhi qüdrət kəsb etməklə onlara həvalə edilən

mə’muriyyətləri lazımınca yerinə yetirirlər. Belə şəxslər İmam Zaman (ə)-ın seçilmiş .köməkçiləridirlər və o həzrətin vilayət məqamına doğru öndə gedənlərdən sayılırlar

:Allah taala Qur’ani-Kərimdə belə buyurur

فَاسْتَبِقُواْ الْخَيْرَاتِ أَيْنَ مَا تَكُونُواْ يَأْتِ بِكُمُ اللّهُ جَمِيعًا

səh:۱۲

Xeyir işlərdə bir-birinizlə ötüşün, hər yerdə olsanız, Allah sizin hamınızı bir yerə“ toplayacaqdır.”(١)

Bu ayə İmam Zaman (ə)-ın seçilmiş səhabələri və böyük şəxsiyyətləri olan ٣١٣ nəfər barəsindədir. Zühur günündə böyük Allah onları Öz evinin kənarında bir yerə toplayacaqdır ki, onlar o həzrətə kömək etsinlər.

Bə’zən müəyyən insanların zehnində belə bir sual yarana bilər: Görəsən, xeyir işlərdə yarışmaq, bir-birindən irəli keçmək dedikdə məqsəd nədir? Həzrət Məhdi ¶-ın seçilmiş köməkçilərindən olan həmin ٣١٣ nəfər hansı fəzilətlərə və xislətlərə malik olduqlarına görə başqalarından öndə gedirlər və o həzrətin məqamını dərk edirlər?!

İmam Baqir (ə) qeyd etdiyimiz ayənin təfsirində belə buyurmuşdur:

اَلْخَيْرَاتُ: اَلْوِلاَيَهُ اَهْلَ الْبَيْتِ.

Ayədə qeyd olunan xeyrat dedikdə məqsəd biz Əhli-beytə məxsus olan vilayət“ haqqıdır.”(٢)

## ONLARIN QÜDRƏTLƏRİNƏ BİR İŞARƏ

### İŞARƏ

İnsan vilayəti qəbul etməkdə nə qədər çox çalışsa, öz ruhunu daha da güclü edəcək, qeyri-adi qüdrəti artacaqdır. Elə bir həddə çata bilər ki, ruhi qüdrət nəticəsində maddi varlıqlara, hətta qeyri-maddi varlıqlara belə hakim olsun.

Mərhum Əllamə Seyyid Bəhrul-ülum astma xəstəliyinə tutulmuşdu və bir gün Əbu Əbdillah (ə)-ın məxsus ziyarətlərindən birini yerinə yetirmək üçün Nəcəfi-Əşrəfdən xaric olmuşdu. Camaat təəccüb edirdi ki, o bu cür xəstəliklə və belə bir qızmar havada necə səfərə gedə bilər?!

Onun həmsəfərlərinin arasında mərhum Şeyx Hüseyn Nəcəf də var idi ki, Seyyidlə müasir olan məşhur alimlərdən biri idi. Onlar öz miniklərinə mindikləri və yola düşdükləri zaman havada bir bulud əmələ gələrək onlara kölgə salır, sərin bir yel əsməyə başlayır və hava o qədər sərinləyir ki, özlərini bir sərdabda imişlər kimi hiss

.edirlər

Nəhayət onlar “Xan Şur” adlı bir yer gəlib yçatırlar. Həmin yerdə böyük alim Şeyx Hüseyn Nəcəfin tanışlarından biri gəlir və o, seyyid Bəhrul-ülumdan ayrılaraq, öz tanışı ilə hal-əhval tutmağa başlayır. Həmin bulud Seyyidin başı üzərinə kölgə salır, nəhayət Seyyid karvansaraya daxil olur. Günəşin qızmar istisi Şeyx Hüseyn Nəcəfin başına saçdığı zaman halı dəyişilir və öz miniyindən yerə düşür. Yaşlı olduğuna və bədəninin .zəifliyinə görə huşdan gedir

səh:۱۳

---

.Bəqərə” surəsi, ayə ۱۴۸“ [۱۴] -۱

.Əl-ğeybət”, Nö’mani, səh.۳۱۴“ [۱۵] -۲

Onu götürüb karvansaraya – mərhum Seyyid Bəhrul-ülumun yanına gətirirlər. Ayıldıqdan sonra o cənab ərz edir: “Seyyidəna, lima lən tudrikənər-rəhmətu?” - “Nə ”?üçün rəhmət bizi əhatə etmədi

Seyyid buyurdu: “Lima təxəlləftum ənha?” – “Nə üçün o rəhmətdən ayrıldınız?” (Bu (cavabda incə bir mə`na vardır.)(١)

İmam Əsr (ə)-ın köməkçiləri maddi aləmdə belə təsərrüf edərdilər. O həzrətin xüsusi köməkçilərindən olan ٣١٣ nəfər də çox qəribə və mö’cüzəli buludlardan istifadə edəcək, zühurun əvvəlində özlərini buludlar vasitəsilə o həzrətə çatdıracaqlar. :Müfəzzəl deyir

قَالَ اَبُو عَبْدِ الله علیه السلام: إِذَا اُذِنَ الْإِمَامُ دَعَا الله بِاسْمِهِ الْعِبْرَانِیّ فَاُتیحَتْ لَهُ صَحَابَتُهُ الثَّلَاثمِاهِ وَ ثَلَاثَه عَشَرَ قَزَعٌ کَقَزَعِ الْخَرِیفِ وَهُمْ اَصْحَابُ الْاَلْوِیَّهِ، مِنْهُمْ مَنْ یُفْقَدُ عَنْ فِرَاشِهِ لَیْلاً فَیُصْبِحُ بِمَکَّه،وَ مِنْهُمْ مَنْ یُرَی یَسِیرُ فِی السَّحَابِ نَهَارًا یُعْرَفُ بِاسْمِهِ وَ اسْمِ اَبِیهِ وَ حِلْیَتِهِ وَ نَسَبِهِ، قُلْتُ: جُعِلَتُ فِدَاکَ اَیُّهُمْ اَعْظَمُ اِیمَانًا؟ قَالَ: اَلَّذِی یَسِیرُ فِی السَّحَابِ نَهاراً وَ هُمْ الْمَفْقُودُونَ وَ فِیهِمْ نُزِلَتْ هذِهِ الآیَه أَیْنَ مَا تَکُونُواْ یَأْتِ بِکُمُ اللّهُ جَمِیعًا

İmam Sadiq (ə) buyurdu: “Hər vaxt imama (zühur üçün) izn verilsə, Allah taalanı ibri dilində çağıracaqdır. Bu zaman ٣١٣ nəfərdən ibarət olan köməkçiləri ona kömək etmək üçün hazırlaşacaqlar. Onlar bir-birinə birləşmiş iki payız buludları kimidir və bir yerə toplanarlar; onlar Məhdi (ə)-ın bayraqdarlarıdırlar. Onlardan bə’ziləri gecə ikən öz yataqlarından yoxa çıxacaq və Məkkədə sübh edəcəklər. Onlardan digər bir dəstəsi də görünəcəkdir ki, gündüz buludların üstündə seyr edəcəklər, onlar adları, atalarının adları, xüsusiyyətləri və məzhəbləri ilə tanınacaqlar. Hətta soruşdum: “Bu iki dəstədən hansı biri iman cəhətindən daha əzəmətlidir?” İmam Sadiq (ə) buyurdu: “Onlar ki, gündüz buludların üstündə seyr edəcəklər. Məhz onlar öz yerlərindən yoxa çıxacaqlar.(٢) Onların barəsində də bu ayə nazil olmuşdur: “Hər yerdə olsanız, Allah (sizin hamınızı bir yerə toplayacaqdır.”(٣

## ZÜHUR ZAMANI İLƏ TANIŞLIQ

İmamın zühur etdiyi dövrdə dünyaya hakim olan vəziyyətlə və o zaman baş verən əzəmətli dəyişikliklərlə tanış olmaq insanı intizar məsələsinə doğru çağırır. Zühur dövründə dünyanın hər bir yerində və insanlarda baş verən dərin dəyişikliklər insanı

.və dünyanı tamamilə başqa bir formada cilvələndirəcəkdir

səh:۱۴

---

.Əl-əbqəriyyul-hisan”, cild ۲, səh.۶۹“ [۱۶] -۱

Biharul-ənvar”, cild ۵۲, səh.۳۶۸; “Ğeybətu Nö’mani”, səh.۱۶۸; “Təfsiri Əyyaşi”, cild“ [۱۷] -۲
.۱, səh.۶۷

.Bəqərə” surəsi, ayə ۱۴۸“ [۱۸] -۳

**Batinin və ruhun paklaşdırılması .١**

E’tiqadi məsələlərdən biri də pak fitrətin pak olmayan fitrətlə necə bir-birinə qarışmasıdır. Rəvayətlərdə qeyd olunmuşdur ki, fitrət dedikdə məqsəd nədir və nə üçün bir-birinə qarışır, necə bir-birindən ayrılıb təmizlənir. Bu məsələnin ətraflı izahı bizim kitabın kiçik həcmilə uyğun deyildir. Buna görə də yalnız aşağıdakı məsələləri :qeyd edirik

Zühur əsrinin xüsusiyyətlərindən biri insanların batinlərinin paklaşdırılması, nəfsin rəzil xüsusiyyətlərdən təmizlənməsidir ki, bu da insanın vücudunda kök salan aludəliklərin .aradan qaldırılmasından ibarətdir

Sual: Nə üçün biz deyirik ki, həzrət Bəqiyyətullahın ¶ zühuru dövründə insanlar batini ?və ruhi rəzilətlərdən paklanacaqlar

:Bu suala cavab verməzdən qabaq, mətləbin izahı üçün aşağıdakı hadisəni qeyd edirik

Şeybə ibni Osman Peyğəmbəri-Əkrəm i-in ən qəliz və qatı düşmənlərindən biri idi və o həzrəti qətlə yetirmək fikrinə düşmüşdü. Belə ki, Hüneyn müharibəsində də iştirak etmişdi ki, Peyğəmbər i-i şəhadətə çatdırsın. Camaat o həzrətin ətrafından dağıldığı, Peyğəmbər yalqız qaldığı bir vaxtda arxadan ona çatdı, lakin oddan olan bir şö’lə ona .tərəf yönəldi, belə ki, ona taqəti olmadı və buna görə də öz məqsədinə nail ola bilmədi

Peyğəmbər ona üz tutub buyurdu: Şeybə yaxına gəl! Bu zaman Peyğəmbəri-Əkrəm i öz əlini onun sinəsinə qoydu. Bu işin nəticəsində o həzrətə qarşı məhəbbət Şeybənin qəlbinə doldu. Belə ki, Peyğəmbəri-Əkrəm i onun nəzərində ən sevimli bir şəxs oldu. Bu zaman o həzrətin hüzurunda müxaliflərlə mübarizəyə başladı, belə ki, əgər atasıyla qarşılaşsaydı belə hökmən Peyğəmbər i-ə kömək etdiyi üçün onu (atasını) qətlə (yetirərdi.(١

Görün, Peyğəmbəri-Əkrəm i-in pak əlləri Onun ən qatı düşmənlərindən birinin napak fitrətini bir anda aludəliklərdən necə təmizləyir, onu kafirlər cərgəsindən ayıraraq .Peyğəmbər i-in ordusuna daxil edir

Peyğəmbəri-Əkrəm i öz mübarək əllərini onun sinəsinə çəkməklə əqlini

kamilləşdirmiş, onun batinində baş verən xoşagəlməzliklərə, zəlalət və azğınlığa şəfa .verərək paklamışdır. Bu müqəddiməni bəyan etdikdən sonra zühur əsrini şərh edirik

:İmam Baqir (ə) buyurur

اِذَا قَامَ قَائِمُنَا وَضَعَ يَدَهُ عَلَى رُؤُوسِ الْعِبَادِ،فَجَمَعَ بِهِ عُقُولَهُمْ وَاَكْمَلَ بِهِ اَخْلاَقَهُمْ

səh:۱۵

---

.Səfinətul-bihar", cild ۱, səh.۲۰۲, Həbəbə maddəsi" [۱۹]-۱

Bizim Qaim qiyam edən zaman öz əlini Allah bəndələrinin başına qoyacaqdır. Bu“ əməldən sonra onların ağıllarını bir yerə yığacaq (buna görə də onların əql qüvvələri (kamilləşəcək) və onların əxlaqlarını təkmilləşdirəcəkdir.”(١)

İmam Zaman (ə.c) özünün bu rəftarı ilə ayrı-ayrı şəxslərin batinlərini paklayacaq, .bütün Allah bəndələrini ruhi və mə’nəvi aludəliklərdən xilas edəcəkdir

**Zühur əsrində əqli qüvvələrin təkamülə çatması .٢**

:İndi isə yuxarıda qeyd olunan rəvayətdəki mühüm və maraqlı məsələni izah edirik

Həzrət Vəliyi-Əsr ¶ əlini yalnız özünün köməkçilərinin və səhabələrinin başına deyil,-١ bütün Allah bəndələrinin başına qoyacaqdır. Yə’ni, o dövrdə Allaha bəndəlik edən bütün insanlar, hətta müharibədə o həzrətin köməkçilərindən olmasalar da belə. Misal .üçün: yaşlıları da, uşaqları da bu böyük ne’mətdən bəhrələndirəcəkdir

İnsanların hamısının ağıllarını pərakəndəlikdən xilas edəcək, beləliklə onlar fikrin-٢ təmərküzləşmə qüdrətinə, düzgün düşüncəyə malik olacaqlar ki, bu da xariqüladə idrakların və elmlərin mənşəyi olacaqdır. Onların əql qüvvələrinin kamilləşməsi bu mə’nayadır ki, öz dövrlərinin imkanında olan bütün qüdrətlərdən istifadə edə .biləcəklər

Bəli, ilahi əlin dünya insanlarının başında qoyulduğu, qeybət dövründə əzab-əziyyətlərə və məşəqqətlərə qatlaşan insanlara nəvaziş edildiyi bir dövrdə insanların beynində gizlənmiş olan xariqüladə qüvvələr əqli təkamül nəticəsində zahir olacaq və özünün ən yüksək mərhələsinə -elm, əməl və mədəniyyət baxımından heyrətləndirici .bir həddə çatacaqdır

Əqlin heyrətləndirici təkamüly və beynin qüdrətilə tanış olmaq üçün aşağıdakı :məsələni qeyd edirik

Hər bir insan –istər fitri iste’dada malik olsun, istərsə də adi səviyyədə – öz beynində“ olan imkanların milyardda birindən artığını öz həyatında işlətmir. Əgər beynin bütün tutumunun və qüdrətinin milyardda birini istifadə edərsə – istər iste’dadlı olsun, istərsə də adi bir insan – onların arasında olan fərq kəmiyyət fərqi deyil, keyfiyyət fərqi

(olacaqdır.”(۲

Yə’ni, hətta yüksək dərəcəli və heyrətli qüdrətdən istifadə edən fitri iste’dadlı insanlar belə, yalnız öz beyinlərindəki hüceyrələrin milyardda birindən istifadə edə bilirlər. Lakin onlar öz beyin hüceyrələrinin milyardda birindən bəhrələnməkdə başqalarından .daha üstündürlər



---

.Biharul-ənvar”, cild ۵۲, səh.۳۳۶“ [۲۰] -۱

.Təvanaihaye xod ra beşenasid”, səh.۳۴۷“ [۲۱] -۲

Bir neçə il öncə müasir riyaziyyatçılardan biri mühüm bir mətləbi camaata çatdırmış“ və təxmini olaraq hesablamışdır ki, insanın beyni praktik olaraq on vahid mə’lumatı öz beynində ehtiyat saxlaya bilər. Əgər bu rəqəmi sadə dillə bəyan etmək istəsək, deməliyik ki, bizlərdən hər birimiz Moskvada yerləşən ən böyük dünya kitabxanasındakı milyonlarla cild kitabın mə’lumatını öz hafizəsində saxlaya bilər. Bu (söz ilk baxışda çox heyrətli nəzərə çarpır.”(١)

Diqqət yetirmək lazımdır ki, insan beyninin qüdrəti dünya islahatçısının parlaq nurlarının saçması nəticəsində təkamülə çatsa və insan öz beyninin milyardda birindən deyil, bütün qüvvələrindən istifadə etsə və beləliklə elm və mədəniyyət !?dünyanın hər yerini bürüsə, görəsən dünyanın görünüşü necə olacaqdır

Əgər insan əqli təkamül nəticəsində öz ruhunun müxtəlif qüdrətlərindən istifadə etsə, cismini də öz ruhuna tabe etdirə və “tərəvvöh” qüdrətinə malik ola bilər. Yə’ni özünün maddi cismini enerjiyə və dalğaya çevirməyə qadir olar. İnsan bu işə qadir olduğu .zaman bir çox kəramətli işləri həyata keçirəcəkdir

Qeybət dövründə də teyyül-ərz qüdrətinə malik olan azsaylı insanlar cisimlərindəki maddiyyat və təcəssüm halətini götürməklə özlərini dalğa və enerji şəklinə salır və bir anda yer kürəsinin başqa bir nöqtəsində zahir olurlar. Onlar malik olduqları bu qüdrətlə özlərinin ruha çevrilmiş cisimlərini istədikləri nöqtəyə doğru hidayət edir və .orada təcəssüm tapa bilirlər

### Dünyada dərin dəyişiklik .٣

Əzəmətli zühur dövründə yer üzündə çox dərin dəyişikliklər baş verəcəkdir. Bu da :Qur’anın buyurduğu ayədir ki

يَوْمَ تُبَدَّلُ الاَرْضُ غَيْرَ الْاَرْضِ

Yer tam başqa vəziyyətdə və yeni şəraitdə qərarlaşar”(٢) Yalnız yer deyil, bütün“ .zaman da yeni dəyişikliklərə mə’ruz qalacaqdır

Bu gün bə`zi alimlər inanırlar ki, maddə səs dalğalarından təşkil olunmuşdur.“ Dalğaları kabel, səs dalğaları, təsvir və s. Vasitəsilə dünyanın ən uzaq nöqtəsinə nəql

etdirmək olar. Nəticədə maddədən ibarət olan orqanizm dalğalara çevrilər və qeyd olunan vasitəsilə kainatın hər bir yerinə göndərilə bilər. Mənim nəzərim budur ki, yaxın gələcəkdə, hətta kosmik səfərlərdən qabaq elə yollar tapıla bilər ki, insan dalğalara .çevrilib fəzaya göndərilsin və bir-birindən ayrılmış olan hissələr orada bir yerə yığışsın

səh:۱۷

---

.Yenə orada, səh.۴۴ [۲۲] -۱

.İbrahim" surəsi, ayə ۴۸" [۲۳] -۲

İndi oxucular bu barədə mühakimə yürüdə bilərlər: insan ruhdan və maddədə təmərküzləşmiş zərrələrdən başqa bir şey deyildir, dalğaların tezliyini aşağı gətirməklə onu istənilən şəklə salmaq olar.(١)

Elə bir günü görmək olarmı ki, insan öz bədənini elektrik cərəyanına çevirib uzaq bir məsafəyə nəql etdirsin və orada bədəni təşkil edən atomların bir yerə yığışması nəticəsində yenidən öz surətinə düşsün.(٢)

Rəvayətlərdə qeyd olunduğu kimi, əqli qüvvələrin ümumi təkamülü nəticəsində ruhun maddəyə qələbə çalması ümumi bir şeyə çevriləcək, insanlar öz cisimlərinə hakim olacaq və bu halətdən yaxşı şəkildə istifadə edə biləcəklər. Namə’lum və əzəmətli olan belə bir gündə camaatın həyatı və onların maddi vasitələrə olan ehtiyacları tamamilə başqa vəziyyətdə olacaqdır.

Əhli-beyt vilayətinin zühuru nəticəsində insanın elm və biliyi mümkün olan ən yüksək həddə çatacaq, insanlar elmin bütün mərhələlərindən çox asan və rahat şəkildə bəhrələnəcək, gizli sirlər aşkar olunacaq, tərbiyə və təkamül yolu onların üzünə açılacaqlar.

Bəlkə də bu mətləblərin qəbul edilməsi bizim üçün çətin olsun, elmi məsələlərdə olacaq bu qədər inkişafları qəbul edə bilməyək. Halbuki bildiyimiz kimi, əgər insanın beyni şeytanın və cəhalətin əsarətindən azad olarsa, bunun ardınca insan bütün yönlərdə təkamülə çatacaq, belə ki, onun üçün dünyada heç bir namə’lum sirr qalmayacaq və bütün çətin elmi məsələlər aşkar olacaqdır.

Həzrət Əli (ə) öz vücudunun ruhundan qaynaqlanan bir kəlamda belə buyurur:

يَاكُمَيْل،مَا مِنْ عِلْمٍ اِلَّا وَاَنَا اَفْتَحُهُ وَمَا مِنْ سِرٍّ اِلَّا وَالْقَائِمُ يَخْتِمُهُ.

“Ey Kumeyl, elə bir elm yoxdur ki, mən onu dərk etməyim və elə bir sirr yoxdur ki, Qaim onu sona çatdırmasın.”(٣)

Bəli, həzrət Bəqiyyətullah (ə)-ın mübarək əllərindən doğan parlaq nurlar zülmə mə’ruz qalan, əzab-əziyyət və işgəncələrə dözən insanların beyninə təkamül bağışlayacaq, çox qəribə qüdrətlərdən istifadə etmək qüdrəti icad edəcək, insanlar vəhy

xanədanının həyat məktəbindəki sirləri qəbul etməyə hazır olacaq və elm və kamalın .ən yüksək mərhələsinə nail olacaqlar

Bu əzəmətli gündə gizlin sirlər aşkar olacaq, dünyanın heç bir yerində zülmətdən əsər-.əlamət qalmayacaqdır

səh:۱۸

---

.Ruh zində mimanəd", səh.۱۵۸" [۲۴] -۱

.Yenə orada, səh.۱۸۸ [۲۵] -۲

.Biharul-ənvar", cild ۷۷, səh.۲۶۹" [۲۶] -۳

## BƏHSİN NƏTİCƏSİ

İntizar ümidvaredici və nicat bağışlayan bir halətdir ki, müntəzirləri qeybətin qaranlıq dövründə heyrət səhrasından xilas edərək nur və səfa vadisinə doğru çəkir. İntizar qəm-qüssəlilərə yeni bir həyat bağışlayacaq, onlara güc-qüvvə verəcək, qəmgin .qəlbləri ümidvar edəcək, şadlıq və parlaqlıqla dolu olan bir dünya yaradacaqdır

İntizar maneələri, zülmətləri aradan aparır, təkamülə çatmış insanların vücudlarında parlaq nur icad edir. İntizar şiənin əsl e’tiqad və maarif toxumlarını müntəzirlərin .qəlblərində cücərdir, ən kamil mə’nəvi həyatı ən fəzilətli insanlar üçün ərməğan gətirir

Əgər özümüzdə intizar halətini icad etmək və gücləndirmək istəyiriksə, vilayətin əzəmətli məqamı ilə ünsiyyətdə olmalı, intizarın qəribə tə’sirləri barəsində mə’lumat kəsb etməli, təkamülə çatmış müntəzirlərin xüsusiyyətlərindən agah olmalı və həzrət Bəqiyyətullahil-Ə’zəm ¶-ın zühuru dövründəki xeyir-bərəkətlərlə öz qəlbimizi və ruhumuzu tanış etməliyik ki, o əzəmətli günün gəlib çatmasının intizarı bütün .vücudumuzu əhatə etsin

,Ruze məhşər ke ze hovləş suxənan mi quyənd

.Rast quyənd, vəli çun şəbe hicrane tu nist

,Qiyamət gününün qorxunc səhnələrindən çox danışırlar; bəli, düz deyirlər)

(.Lakin sənin hicranının gecəsi kimi deyildir

səh:۱۹

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.v.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

